**UOT 668 652**

# "AZƏRXALÇA" İSTEHSALAT BİRLİYİNDƏ İSTEHSAL OLUNAN XALÇALARIN BƏDİİ-ESTETİK GÖSTƏRİCİLƏRİNİN TƏDQİQİ

**A.X.ƏLİYEVA**

*Məqalədə "Azərxalça" İstehsalat Birliyində istehsal olunan xalçaların bədii estetik göstəricilərindən bəhs olunur. Qeyd olunur ki, hazırda "Azərxalça" İstehsalat Birliyinin respublikanın bütün rayonlarında filialları vardır. Birlikdə çalışan rəssamlar, başda xalça çeşidlərinin məhşur ustası mərhum Lətif Kərimovun ideyasına sadiq qalmaqla xalçaların bədii estetik göstəricilərinin daha da yüksəldilməsinə çalışırlar. Birlikdə istehsal olunan xalçalar respublika daxilində və xaricində geniş istifadə olunur.*

***Açar sözlər**: xalçalar, dekorativ tətbiqi incəsənət əsəri, kilim, cecim, sumaq, əriş, arğac, xana, payəndaz, güləbətin, xovlu, xovsuz xalçalar.*

Azərxalça" İstehsalat Birliyi respublikanın bütün rayonlarında filialları olan, əhalinin kənd ərazilərində yaşayan hissəsinin işlə təmin edən çox böyük təşkilat sayılır.

"Azərxalça" İstehsalat Birliyində xalçaçılıq sahəsində işləyən ustalar tərəfindən yaradılmış xalça , ornamentləri daim dəyişir . Bu ornamentlər tətbiqi dekorativ incəsənət əsəri səviyyəsində qalxa bilmişdir . Birliyi yaratdıqları xalça mallarından həm respublikada həm də xaricdə geniş istifadə edilir . Hazırda birliktə çalışan rəssamlar, başda xalça çeşnilərinin mərhum ustası Lətif Kərimovun ideyasına sadiq olmaqla xalçaların bədii estetik göstəricilərinin daha da yüksəldilməsinə daim durmadan çalışırlar . Bu rəssamlar birlikdə istehsal olunan xalçaların, tematik, süjetli, dəyərli, gözəl, bəzəkli, naxışlı, əlvan olmasına daha çox fikir verirlər.

Hal – hazırda "Azərxalça" İstehsalat Birliyinin , Quba – Şirvan zonasında xovsuz sumaq xalçası hazırlanır bu xalçanın hazırlanmasında istifadə olunan iplərin hamısı yundur . Birlikdə ən çox xovlu xalçalar istehsal olunur .

Xovlu xalçaların iplə toxunuşu "Düyünləmə" üsulu yəni "dolama – iplə " adlanır . Xovlu xalçalar adətən 2 hissədən ibarətdir .

- Xalçaların yeləni ( kənar hissəsi )
- Xalçaların mərkəzi ( orta hissəsi )

Ümumiyyətlə xovlu və xovsuz xalçaların keçdiyi inkşaf yolunun 4 əsas ardıcıl dövrə bölmək olar:

1-ci dövr xalça sənətinin ibtidai dövrüdür. Bu dövrə "Sadə keçirilmə" texnikası ilə, yəni arğacların başdan başa ərişlər arasında müəyyən üsulla keçirməklə toxunan həsir , palaz, sonralar isə cecim toxunan üsul inkşaf edib. Bu dövrdə toxunan xalça məmulatın bəzəksiz, saya yerli və birrəngli olmuşdur.

2-ci dövr – xalça sənətinin texniki və başlıca olaraq bədii cəhətdən inkşafının ilk dövrüdür. Bu dövrdə sadə dolama texnikası ilə əmələ gələn kilim toxuma üsulu inkşaf edir. Kilim (sadə dolama) dolama üsulunu xalça sənətinin inkşafında çox böyük əhəmiyyəti olmuşdur . Bu texnikanın meydana gəlməsi və xalçaların üzərində ibtidai formalarda sadə naxışlar toxumağa imkan yaratmışdır.

3-cü dövr – Vərni, Şəddə, Zili və Sumaq toxuma üsulunun meydana gəlməsi dövrüdür . Mürəkkəb dolama texnikasının çox geniş yayıldığı bu dövrü xalça sənətinin inkşafında böyük irəliləyiş dövrü hesab etmək olar .

4-cü dövr – Düyünləmə , yəni əvvəllər dolama , sonralar isə güllabı ilmə texnikası ilə əmələ gələn xovlu xalça toxuma üsulunun inkşaf etdiyi dövrüdür . Bu dövrü istər texniki , istərsə də bədii cəhətdən xalça sənətinin yüksək inkşaf dövrü hesab etmək olar .

"Azərxalça" İstehsalat Birliyi müəssisələrində istehsal edilən xalçalar 2 növə bölünür:

- Quba – Şirvan;
- Qazax – Qarabağ;

Quba – Şirvan xalçaları əsasə yüksək ilmə sıxlığı , nəbatət çeşnisi ilə həndəsi ornamentləri və xovunun qısalığı ilə seçilir .

Qazax – Qarabağ xalçaları, Quba – Şirvan xalçalarından fərqli olaraq , ilmə sıxlığı aşağıdır, xovu uzundur .

Xalça mallarının sortlaşdırılması ilk dəfə "Azərxalça" İstehsalat Birliyi müəssisələrində texniki nəzarət şöbələri tərəfindən aparılır. "Azərxalça" İstehsalat Birliyi müəssisələrində xalça mallarını qəbul edərkən akt tərtib olunur. Bu aktda texniki nəzarət şöbələri tərəfindən verilmiş nömrə hər bir xalçanın fabrik nömrəsi, çeşnisi, ölçüləri, sıxlığı, növü, çeşninin mürəkkəblik dərəcəsi, rəngli və s. yazılır. Yarlıqda "Azərxalça" İstehsalat Birliyinin ünvanı, fabrikin adı,

xalçanın nömrəsi, artiklı, sıxlığı, 10 kv santimetrdə yerləşən ilmələrin miqdarı, RST-nın nömrəsi, ölçülərin sahəsi, 1 kv metr qiyməti, tarix və nəzarətçinin möhvrü olur.

Xalçaların satış qiyməti artikula əsasən müəyyənləşdirilir. Artikul isə xalçanın 10 kv santimetrdə yerləşən ilmələrin sayına görə götürülür. İndi isə "Azərxalça" İstehsalat Birliyi müəssisələrində istehsal edilən Quba – Şirvan qrupuna daxil olan xalçaların sıxlığı 10 kv santimetrdə ilmələrin miqdarı , artikulu aşağıdakı cədvəl üzrə göstərə bilərik .

| Artikul | Sıxlıq | İlmələrin miqdarı 10 sm^2 |
|---|---|---|
| Az-17 | 45x45=20,25 | 200,1-210,0 |
| Az-18 | 46x46=211,6 | 210,1-220,0 |
| Az-19 | 47x47=220,9 | 220,1-230 |
| Az-20 | 48x48=230,4 | 230-240,0 |
| Az-21 | 50x50=250,0 | 250 |
| Az-25 | 50x50 | |

Cədvəldən göründüyü kimi Az-17 artikulu parça əl ilə toxunulmuşdur . Bu xalçanın əriş və arğacı pambıq ipindən ibarətdir. Toxunuşu ilə yundur . Ölçüsü 3,0 x 80 = 2,40 cm . Sıxlığı 45 x 45 , 10 kv santimetrə düşən ilmələrin miqdarı 200,1 - 210 qədər olur .

Qarabağ qrupuna daxil olan xalçaların sıxlığı aşağı olur . Əriş və arğac ilmələrinin miqdari hər 10 kv cm - ə 37 dən 44 ə kimi olur . Xovun hündürlüyü 7 mm –dir . Çeşni nisbətən iri elementlərdən ibarətdir saya yeri çoxdur . Qarabağ qrupuna daxil olan xalçaların sıxlığı 10 kv sm – də ilmələrin miqdarı , artikulu cədvəl üzrə verilmişdir .

Cədvəldən görüldüyü kimi Az-16 artikulu xalça Qarabağa çeşnisinə aiddir . Bu xalça əllə toxunulmuşdur . Onun toxunmasının yun ipliyindən istifadə edilmişdir. Onun hündürlüyü, 6 – 7 mm –dir. Sıxlığın 44 x 44 , 10 kv cm-də olan ilmələrin miqdarı 190,1 – 200,0 olur. Bu xalçalar alıcılar tərəfindən yüksək tələblə alınır. Xalçaların ilmə sıxğlığı nə qədər yaxşı olarsa, satış qiymətidə baha olar.

"Azərxalça" İstehsalat Birliyində 80 - ə qədər müxtəlif çeşnili xalçalar toxunur. Ən çox yayılmış və geniş şöhrət qazanmış çeşnilərdən biri də "Pirəbədil" çeşnisidir. Bu çeşni Quba qrupuna aiddir , sıxlığı 50 x 50 – dir . Pirəbədil çeşnisinin bir neçə növü məlumdur . Məsələn :

"Pirəbədil – 3", "Pirəbədil – 78", "Pirəbədil – 86" və "Heyratı Pirəbədil" və s.

Azərbaycanın xovlu və xovsuz xalçalarını texniki və bədii xüsusiyyətlərinə görə 4 böyük növə bölmək olar :

1-ci növ Quba – Şirvan ;

2-ci nöb Gəncə - Qazax;

3-cü Qarabağ;

4-cü Təbriz növüdür.

Quba – Şirvan xalça növü öz növbəsində 3 qrupa bölünür :

1-ci Quba qrupu;

2-ci Şirvan qrupu;

3-cü Bakı qrupu;

- Quba – bu rayonun "Köhnə Quba", "Quba", "Xırda gülçiçi", "Alça gülçiçi", "Qədim minarə", "Hacı Qayıb" və "Sumaq" xalçaları şöhrət qazanmışdır.
- Dəvəçi – Dəvəçinin "Yaraşıqlı", "Şahdərmə", "Molla Kamalı", "Pirəbədil", "Heyrat – Pirəbədil", "Çaran" xalçaları geniş yayılmışdır .
- Qonaqkənd – Bu rayonun "Oruc", "Afurca", "Cimi", "Xaşı", "Qonaqkənd", "Xan" və "Sələmə-söyüd" xalçaları geniş yayılmışdır.

Şirvan qrupu : Bu qrup aşağıda göstərilən rayonların məhşur xalçaçılıq məntəqələrini əhatə edir .

- Şamanı -Bu rayonun "Şirvan", "Qobustan", "Şamaxı", "İsradim" və "Ərciman" xalçaları çox şöhrət tapmışdır .
- Mərəzə - Mərəzənin müxtəlif xalça məntəqələrində toxunan "Mərəzə", "Kabur", "Çuxanın" və "Cəmcəmli" xalçaları məşhurdur.
- Ağsu – bu rayonun "Biço", "Təşəd", "Pirhəsənli" xalçalarının özünə məxsus gözəlliyi var.

Bakı qrupu. Bu qrupa aşağıdakı rayonların qrupu daxildir:

- Abşeron yarımadası – "Bakı", "Xilabətuna", "Xilə Əmircan", "Suraxnı", "Novxanı" və "Fatmayı" xalçarı ilə məşhurdur .
- Xızı – "Fındıcan", "Kədi" kimi məşhur xalçalarını və zilisini qeyd etmək olar .

Quba – Şirvan növünə daxil olan xalçaların ölçüsü daha kiçikdir . Bu xalçaların ilmə sıxlığı ümumiyyətlə 40 x 40 – dan 55 x 55 - ə kimi olur . Deməli , xalçanın hər kv metrində 160 mindən çox 300 minə qədər ilmə yerləşir . Quba – Şirvan xalçaları kiçik və orta ölçüdə toxunur . Quba – Şirvan xalçalarının ilmə hündürlüyü , yəni qalınlığı 3 mm – dən 6 mm - ə qədər olur .

**Nəticə**:

- "Azərxalça" İstehsalat Birliyinin respublikamızın bütün rayonlarında filialları olan, kəndlərdə yaşayan əhalini işlə təmin edən çox böyük müəssisə sayılır.
- "Azərxalça" İstehsalat Birliyinin istehsal olunan xalçalar respublikamızda və xaricdə çox geniş istifadə olunur.
- "Azərxalça" İstehsalat Birliyində çalışan xalça rəssamları, başda çeşnilərinin məhşur ustası olan mərhum Lətif Kərimovun ideyalarına sadiq qalmaqla xalçaların bədii-estetik göstəricilərini daim yüksəldirlər.

**ƏDƏBİYYAT**

**1.** .P.Həsənov və başqaları qeyri-ərzaq mallarının ekspertizası , 1-ci hissə, Bakı 2006. **2**. Ə.P.Həsənov və başqaları istehsal mallarının estetikası, Bakı 2014. **3**. Xalça mallarının keyfiyyət göstəricilərini tənzimləyən texniki – normativ sənədlər, 2015. **4.** "Azərxalça" İstehsalat Birliyinin materialları 2016 – 2017 .

**Исследование художественно-эстетических свойств ковров производимых в производственном объединении "Azərxalça"**

**А.Х. Алиева**

В статье говориться об эстетических свойствах ковров производимых в Производственном Объединении "Azərxalça".Отмечается,что в данный момент Производственное Объединение "Azərxalça"существует во всех районах республики.Художники работающие совместно применяют все идеи знаменитого мастера Латифа Керимова для улучшения эстетических свойств ковров.Ковры производимые в объединении широко используются ,как внутри республики ,так и за границей.

***Ключевые слова:*** ковры,декоративная прикладная художественная работа,уток и заворачивание ковров,ковры с ворсинками,ковры без ворсинок,производство ковров;

**Researchofartistic-esthetic indicators of carpetsproduced in"Azerkhalcha" productionassociation**

**A.X.Aliyeva**

Artistic-esthetic indicators of carpets are mentioned in this article. It is noted that there are branches of " Azerkhalcha" Production Assosiation in all distircts of the republic. Artists working in the Association, including being comitted to the ideas of the deceased master Latif Karimov are trying to increase artistic-esthetic indicators of carpets. Carpets made in the Association are widely used inside and outside the republic.

***Key words:*** carpets, decorative applied artwork, rug, cecim, sumak, arish, argak, khana, platinum, gulets, heap,carpet artists.